**UOT 334. 7**

# KİÇİK VƏ ORTA SAHİBKARLIĞIN İNKİŞAFINDA MÖVCUD PROBLEMLƏRİNİN ARADAN QALDIRILMASI YOLLARI

**V. İ. SALIYEVA**
**Azərbaycan Dövlət Aqrar Universiteti**

*Kiçik və orta sahibkarlıq hər bir ölkənin iqtisadiyyatının inkişafında mühüm əhəmiyyətə malikdir. Onu iqtisadiyyatın lokomotivi adlandırırlar. Bundan başqa kiçik və orta sahibkarlığın inkişafı sosial-siyasi sabitliyi təmin edir, əhalinin məşğulluq imkanlarını genişləndirir və bununla da işsizliyin və sosial gərginliyin azaldılmasına şərait yaradır. Lakin kiçik və orta sahibkarlar öz fəaliyyətində böyük çətinliklərlə qarşılaşır. Bunu həm inkişaf etmiş ölkələrin təcrübəsi, həm də Azərbaycanda sahibkarlığın təcrübəsi göstərir. Məqalədə kiçik və orta sahibkarlıqda mövcud olan problemlər şərh edilir və onların aradan qaldırılması yolları araşdırılıb.*

***Açar sözlər:*** *sahibkarlıq, sahibkarlıq fəaliyyəti, kiçik və orta sahibkarlığ, sosial müdafiə, sosial-siyasi sabitliy, güzəştli kredit, vergi sistemi, investisiya.*

Kiçik və orta sahibkarlar öz fəaliyyətində böyük çətinliklərlə qarşılaşır. Bunu həm inkişaf etmiş ölkələrin təcrübəsi, həm də Azərbaycanda sahibkarlığın təcrübəsi göstərir.

Respublikada fəaliyyət göstərən kiçik müəssisələr əsasən aşağıdakı problemlərlə qarşılaşırlar: istehsalın inkişafının xüsusi maliyyə vəsaitinin çatışmamazlığı, hüquqi təminatın qeyri-sabitliyi, məhsulun satışı problemi, xammal və materialın əldə edilməsində çətinliklər, daxili bazarın zəif qorunması, idxal edilən malların respublikada hakim rol oynaması, dövlət orqanlarının xüsusi ilə də yerli hakimiyyət, hüquq-mühafizə və maliyyə orqanlarının kiçik müəssisə sahibinin işinə tez-tez müxtəlif yollarla mane olması və s. [4, səh. 170].

Kiçik və orta sahibkarlığın inkişafında əsas problem onların istər maddi-texniki, istərsə də maliyyə cəhətdən kifayət qədər resurs bazasına malik olmamasıdır. Praktik olaraq xalq təsərrüfatının bu yeni sektorunun inkişafına, demək olar ki, sıfırdan başlanılır. Keçən onilliklər ərzində bu sektor demək olar ki olmamışdır. Bu prosesin səbəbi o zamanki iqtisadi sistemin sahibkarlığı bir istehsal faktoru kimi tanımaması idi. Digər səbəb sahibkarların hazırlanması ilə bağlıdır. Bu da kiçik və orta sahibkarlığın inkişafında daha bir mühüm problem –kadr probleminin olmasına gətirib çıxarır.

Bundan əlavə əhalinin əsas kütləsi əmək haqqı ilə yaşadığından işgüzar fəaliyyəti həyata keçirmək üçün tələb olunan ehtiyat maliyyə vəsaitlərinə malik olmamışdır. Bu problem indinin özündə də qalır. Dövlət büdcəsinin hədsiz dərəcədə gərgin vəziyyəti bu sahədə vəsait mənbəyi rolunu oynamağa imkan vermir. Beləliklə yeganə ümid kredit resuslarına qalır. Bu isə hər hansı problemin həllindəmühüm rol oynamağına baxmayaraq artan inflyasiya şəraitində çətinliklə reallaşdırılır.

Bu sahədə vəziyyət gərgin olsa da onu müsbət istiqamətdə yönlətmək mümükündür. Vəziyyəti kiçik və orta biznesədövlət dəstəyi göstərməklə düzəltmək olar.

Kiçik biznesin dövlət tərəfindən birbaşa və zəmanətli borc vasitəsiylə dəstəklənməsi diqqətə layiqdir. Dövlət dəstəklənməsinin başqa formaları da mövcuddur: kiçik müəssisələrinin dövlət sifarişi ilə (əgər belə zərurət meydana çıxarsa) təmin edilməsi, sənayecə zəif inkişaf etmiş rayonlarda yaradılan müəssisələrə xüsusi güzəştlərin verilməsi və s. [4,səh.169.]

Onu da qeyd etmək lazımdır ki, kiçik və orta müəssisələrin yaradılışı zaman əldə olan resuslarının həcmi əhəmiyyətli dərəcədə artmışdır. Lakin bu resusların həcmini daha da artırmaq mümkündür. Bu məqsədlə ilk növbədə cəmiyyət üçün əlverişli olan prioritetlərin seçilməsi və əməli olaraq tətbiq edilməsi tələb olunur. Xarici iqtisadi fəaliyyət də daxil olmaqla güzəştli kreditləşmə və güzəştli vergiqoyma mexanizmi hazırlanmalıdır. Sahibkarlığın inkişafına əlverişli şərait yaradılması istiqamətində xalqın tələbatının təmin edilməsi ön plana çəkilir.

Kiçik və orta sahibkarlığın inkişafında önəmli olan problemlərdən biri də qanunvericilik bazasının təkmil olmamasıdır. [5] Hazırda bir sıra MDB ölkələrindən fərqli olaraq respublikamızda bazar münasibətinə keçidlə bağlı bir sıra qanunlar (mülkiyyət haqqında, torpaq islahatı haqqında, icarə haqqında, müflisləşmə haqqında və s) qəbul edilmiş, demək olar ki islahatların hüquqi bazası formalaşmışdır. Lakin yenədə bu sahənin təkmilləşdirməyə ehtiyacı var.

Digər problem doğuran məsələlərdən biri də kiçik müəssisədə təsərrüfat fəaliyyətinin dərin təhlilinin aparılmamasıdır [3, стр. 125]. Sahibkarların fəaliyyətinin nəticələri ilə bağlı hesabat sənədlərinin olmaması bu sahədə vəziyyəti bir qədər mürəkkəbləşdirir.

Kiçik və orta sahibkarların texniki təchizatı kifayət qədər etibarlı deyildir. Onlar üçün nəzərdə tutulan və onların spesifik xüsusiyyətlərini nəzərə alan maşın, avadanlıq və digər əsas istehsal vasitələri demək olar ki, yox dərəcəsindədir. Bundan əlavə kiçik müəssisələrin yüksək texnologiyalara nail olması məhduddur. Bu onunla əlaqədardır ki, yüksək texnologiyanın əldə edilməsi üçün külli miqdarda maliyyə xərcləri tələb olunur. Kiçik sahibkarların maliyyə vəsaitləri isə məhduddur.

Sahibkarlıq fəaliyyətinin ənmürəkkəb problemlərdən biridə onun sosial müdafiəsidir. Əvvəllər ictimai fondların bölgüsü əsasında mövcud olan sosial təminat sistemi bazar münasibətlərinə hazırki dövrdə tamamilə dağılmışdır. Əhalinin gəlirləri əsas etibarilə ilkin tələbat məhsullarının, hər şeydən əvvəl, qida məhsullarının əldə edilməsinə yönəldilir. Bu proses mahiyyət etibarıilə kiçik və orta sahibkarlığa da aiddir. Kiçik və orta sahibkarların gəlirləri çox olanda onun bir hissəsi yığıma yönəldilir, az olanda isə istehlaka yönəldilməyə başlayır.

Kiçik və orta sahibkarlığın inkişafı iqtisadiyyatın bu sferasında məşğul olan işçilərin sosial müdafiəsi ilə əlaqədardır.

Kiçik sahibkarlığın inkişafı hər şeydən əvvəl böyük məbləğdə sərmayə qoymadan, əvvəllər istifadə olunmayan ehtiyyat mənbələri hesabına yeni iş yerləri yaratmaq deməkdir. Kiçik sahibkarlıq həmçinin sosial-siyasi sabitliyi təmin edir, əhalinin məşğulluq imkanlarını genişləndirir və bununla da işsizliyin və sosial gərginliyin azaldılmasına şərait yaradır [1, səh39]

Iri müəssisələrdən fərqli olaraq kiçik və orta biznes subyektlərinin əksəriyyətində, xüsusilə fəaliyyətə başladıqları ilk dövrlərdə lazımı maliyyə vəsaiti və xüsusi sosial infrastrukturu olmur, istehsal-texniki silahlanma səviyyəsi aşağı olur. Əməyin mühafizəsi və texniki təhlükəsizlik məsələsi həll edilmir.

Dövlət proqramında kiçik və orta müəssisələrin işçilərinin dövlət pensiya sosial, tibbi sığorta sisteminin islahatı nəzərdə tutulur. Sahibkarların təhlükəsizliyini və kiçik və orta müəssisələrini möhkəmləndirmək məqsədilə müvafiq qanuanvericilik bazasının formalaşdırılması, kiçik sahibkarlıq obyektlərinin əmlakın qorunub-saxlanılması təmin edən firma şəbəkəsinin genişləndirilməsi üzrə işi davam etdirilmək lazımdır.

Azərbaycan Respublikası Prezidentinin "Sahibkarlığın inkişafına mane olan müdaxilələrin qarşısının alınması haqqında" 28 sentyabr 2002-ci il tarixli fərmanına əsasən bir sıra mərkəzi və yerli icra hakimiyyətli orqanlarının nəzarət və yoxlama funksiyalarını yerinə yetirən müxtəlif qurumları ləğv edilmiş və hüquq-mühafizə orqanlarının sahibkarlıq subyektlərinə müdaxiləsi qadağan edilmişdir. Bu fərman kiçik və orta sahibkarların fəaliyyətinə yerli icra və hüquq-mühafizə orqanları tərəfindən yersiz müdaxilələrin aradan qaldırır.

Hazırkı vaxtda kiçik və orta sahibkarlıq maliyyə dəstəyi mexanizmi formalaşıb. Mövcud qanunvericiliyə uyğun olaraq kiçik müəssisələr müəyyən vergi güzəştlərindən istifadə edirlər: onlar üçün sadələşdirilmiş vergi sistemi tətbiq olunur.

Hazırda Azərbaycan hökuməti kiçik və orta sahibkarlara yardım üzrə üç müxtəlif plan həyata keçirir. Onlardan ən irisi Azərbaycan İnvestisiya Şirkətidir ki, o müəssisələrə investisiya qoyaraq, onlarda ən azı 1 milyon ABŞ dolları məbləğində paya malik olur. Sahibkarlığa Kömək Milli Fondu kiçik və orta sahibkarlara çox güzəştli kreditlər verir.

IFC –nın sorğusunun nəticələrinə görə sahibkarların yarıdan çoxu maliyyə resuslarına çıxış problemi ilə yəni biznesin inkişaf məqsədilə maliyyə resuslarının çatışmaması ilə üzləşir. Təyin olunmuş fonddan vəsait alan müəssisələrin sayı, maliyyə vəsaitinə çıxışda sıxıntı çəkən müəssisələrin ancaq bir faizini təşkil edir. Sahibkarlığa dövlət dəstəyi tədbirlərinin səmərəsinin yüksəldilməsi istiqamətində həyata keçirilmiş məqsədyönlü tədbirlər nəticəsində mühüm naliyyətlər əldə edilmişdir. Dövlət – sahibkar münasibətlərinin inkişaf etdirilməsi, sahibkarlığın dövlət tənzimlənməsi sisteminin təkmilləşdirilməsi sahəsində görülmüş işlər nəticəsində müdaxilə halları azaldılmışdır. Bundan başqa, sahibkarlığa dövlət maliyyə dəstəyi mexanizmi yaradılmışdır və bu mənbə kiçik və orta sahibkarların maliyyə vəsaitlərinə olan tələbatının ödənilməsinin real mənbəyi kimi çıxış edir. Sahibkarlığın məsləhət, informasiya təminatının gücləndirilməsi və işgüzar əlaqələrinin inkişafı istiqamətində mütəmadi tədbirlər həyata keçirilməkdədir.

Sahibkarlığın məsləhət, informasiya təminatının gücləndirilməsi və işgüzar əlqaələrinin inkişafı istiqamətində işlər davam etdirilir. Ötən il sahibkarların işgüzar əlaqələrinin inkişafının dəstəklənməsi istiqamətində həm ölkənin daxilində, həm də xarici mühüm iqtisadi tədbirlər, o cümlədən biznes forumlar, sərgilər, seminar və konfranslar keçirilmişdir. Bu tədbirlərin keçirilməsi istər ölkənin biznes mühitinin və iqtiasadi potensialının təbliği, istərsə də yerli sahibkarların işgüzar əlaqələrinin inkişafı baxımından əhəmiyyətli olmuşdur.

Azərbaycan Respublikası Prezidentinin "Sahibkarlığın inkişafına mane olan müdaxilələrin qarşısının almması haqqında" 2002-ci ii 28 sentyabr tarixli 790 nömrəli Fərmanın 11-ci bəndinə əsasən, sahibkarların hüquqlarınınqorunmasının mühüm mexanizmlərindən biri də sahibkarlıq fəaliyyəti ilə məşğul olan subyektlərin Nazarət Kitabçası ilə təmin edilməsi, yoxlamalarla bağlı həmin kitabçalarda olan qeydlərin təhlil edilərək bu barədə ildə iki dəfə, eləcə də sahibkarların fəaliyyətinə mane olan qanunsuz müdaxilə edənlər haqqında operativ əlaqə sistemi

vasitəsilədaxil olan məlumatlar üzrə görülmüş tədbirlərin nəticəsi barədə mütəmadi olaraq Azərbaycan Respublikası Prezidentinə məlumat verilməsidir.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin ölkədə fəaliyyət göstərən sahibkarlıq fəaliyyəti subyektlərinin "Nəzarət Kitabçası" ilə təminatının sadələşdirilməsi, o cümlədən bu kitabçaların sahibkarlıq subyektlərinə əvəzsiz olaraq verilməsinin təmin edilməsi ilə bağlı 2008-ci il 11 avqust tarixli Azərbaycan Respublikasının İqtisadi İnkişaf Nazirliyi sahibkarlıq subyektlərini, onların filial və nümayəndəliklərini, rəsmi müraciətləri əsasında və aidiyyəti dövlət orqanları vasitəsilə əvəzsiz olaraq "Nəzarət Kitabçaşı" ilə təmin edir.

Göründüyü kimi sahibkarlıq fəaliyyəti bazar iqtisadiyyatında önəmli yer tutur. Sahibkarlıq fəaliyyəti olmadan bazar iqtisadiyyatını təsəvvür etmək mümkün deyil. Keçid dövrünü yaşayan ölkələr öz iqtisadiyyatını inkişaf etdirmək üçün ilk növbədə sahibkarlıq fəaliyyətinin inkişaf etdirməli, dövlət ölkədə sahibkarlıq fəaliyyətinin inkişafı üçün stimul yaratmalıdır.

## ƏDƏBİYYAT

1. A. B. Abbasov “Sahibkarlıq fəaliyyəti: növləri, təşəkkülü və inkişaf problemləri” Bakı -1998. , səh. 211. 2. A. R. -nın İqtisadi İnkişaf Nazirliyi “Sahibkarlığa Kömək Milli Fondu “Kiçik və orta sahibkarlıq subyektləri üçün əyani vəsait”. 3. А. О. Баинов, И. Н. Шапкин “Малое предпринимательство”. Москва-2003. , стр. 350. 4. V. B. Musayev, İ. Z. Seyfullayev “Sahibkarlığın əsasları” Bakı – 2002. , səh. 382. 5. Sahibkarlıq fəaliyyəti haqqında AR qanunu.

## Пути решения проблем развития малого и среднего предпринимательства

**В. И. Салыева**

Малое и среднее предпринимательство имеет огромное значение в развитии экономики каждой страны. Его называют локомотивом экономики. Кроме этого развитие малого и среднего предпринимательства обеспечивает социально-политическую стабильность, расширяет возможности занятости населения и этим способствует снижению безработицы и социальной напряженности в стране. Но малые и средние предприниматели в своей деятельности сталкиваются с большими трудностями. Это показывает опыт развития предпринимательства и в экономически развитых странах, и у нас в Азербайджане тоже. В статье анализируются проблемы имеющиеся в развитии малого и среднего предпринимательства и рассмотрены пути их решения.

***Ключевые слова:*** *Предпринимательство, предпринимательская деятельность, малое и среднее предпринимательство, социальная защита, социально-политическая стабильность, льготный кредит, налоговая система, инвестиция.*

## Ways to eliminate existing problems in the development of small and medium-sized businesses

**V. İ. Salıyeva**

Small and medium entrepreneurship is crucial for the economic development of each country. They call it the locomotive of the economy. In addition, the development of small and medium-sized businesses provides social and political stability, expanding the employment opportunities of the population, thereby contributing to the reduction of unemployment and social tension. However, small and medium-sized businesses face major difficulties in their activities. This is the experience of developed countries, as well as the experience of entrepreneurship in Azerbaijan. The article discusses the problems existing in small and medium-sized businesses and explores ways to address them.

***Key words:*** *entrepreneurship, entrepreneurial activity, small and medium-sized business, social protection, socio-political stability, preferential credit, tax system, investment.*